# KAŞ HAMIMIZ QUŞ OLSAQ

Nədi, yenə nə olub? İmkan verin də!!. Həqiqətən artıq mənə cana gətirmisiniz!!. Bezdirmisiniz!!. Sizin əlinizdən hara gedim heç bilmirəm? Uşaq olanda nə olar? İnsanı hər iş dalınca buyurmazlar ki. Yox, sizin niyyətiniz məni öldürməkdir. Gəlmirəm dedim. Mən nə bilim kimi istəyirsən onu göndər. Gəlməyəcəm, vəssəlam.....hə təxminən beş dəqiqə çəkən müqavimətin yekununda anamla razılaşmış və kəndin demək olar ki, tam ayağında yerləşən marketə getmişdim. Yəni bu qədər danışıqdan sonra bu heç iş deyildi, amma nə edim. əldən nə gəlir, uşaq oldun belədir də. Elə bilirlər harda nə bir iş oldu ora uşağı göndərmək lazımdır. Düzdür, mən elə də uşaq sayılmazdım, yəni təxminən 11 yaşım olardı. Ancaq nə fərqi var. Eh bilirsiniz nə var, hər iki halda vəziyyət eyni cürdür. Deyəsən məsələ uşaq olub olmamaqda deyil, məsələ mənim bu işlərlə heç bir şəkildə məşğul olmaq istəməməyimdədir. Bəlkə burada problemli olan mənəm. Yəni onlara görə. Yoxsa mənə görə bu çox normal bir şeydir ki,  bu işləri etmək yerinə

daha faydalı bir şeylə, məsələn xəyal etmək və xəyalında istədiyin yerə getmək kimi şeylərlə, məşğul olasan..nəysə, nəysə, burada mənim başqalarının sözləri ilə desək tənbəlliyim haqqında vermiş olduğum məlumat bəsdir. Əsas odur ki, mən normal insanların tənbəl adlandırmasına layiq biri idim..qoy olsun.. o gün bu kimi şeyləri fikirləşə-fikirləşə marketə gedirdim. Market də olanda belə yerdə olar da. Dəhşət! Kəndin ayağı nə deməkdir?! Yəni başa düşürəm bu o qədər də böyük bir kənd deyildi, amma nə olsun axı heç olmazsa, ikisi lazımdı ki, mənim kimi tənbəl insanlar da bu qədər əziyyətə, ana danlağına məruz qalmaya....küçə ilə gedirdim. Yolda qonşumuz sayıla biləcək bir qadın mənə salam verdi. Hə, düşünə bilərsiniz ki, gərək mən birinci ona salam verəydim. Axı mən bunu necə edəydim, tam o əsnada beynimin içərisində kim bilir nələr baş verirdi. Nələr haqda fikirləşirdim? Kim bilir? Mən? Hamsını yox, ancaq bir qismini yəqin ki, bilməmiş olmaram. Anamın məni çörək almağa göndərməsi ilə bağlı ürəyim soyumamış olduğundan yolda bir az bu haqda danışıb, yəni elə ürəyimdə, sonra da xəyal gücümü burada işə salmağa başladım. hörmətli xəyal

gücüm, bilirəm ki, bu sənə çox ağırdır. İş indi belə gətirib, gəl mənə bir az yardım et. Gəl fikirləşək ki, biz indi çörək almağa getmirik, taxta çıxmaq üçün gedən bir kraliçayıq. Əla! Demək belə, fikirləşməyə davam edə bilərsən. Aha, artıq özümü kraliçaların geyinmiş olduqları geyimlərdə təsvir edirəm. Paltarım yəqin ki, yaşıl rəngdədir. İrəliləyirəm..irəliləyirəm.. hələ də irəliləyirəm. Mən yeridikcə paltarımım ətəkləri yerə dəyir. Kənardan biri kömək etmək məqsədi ilə istəyir ki, paltarımın ətəyini tutsun, ancaq mən ona icazə vermirəm ki, buna ehtiyac yoxdur. Nəticədə mən öz paltarımın ətəklərini tutmaqdan aciz deyiləm ki! Yaxşı, yaxşı, əsəbləşmə. Bir az da gedirəm , hələ taxtıma çatmamışam...az qalıb.. mən irəlilədikcə saray əhli yavaş-yavaş tənzim etməyə başlayır və mənim bundan da xoşum gəlmir ki, bəs axı siz nəyə görə bir insanın qarşısında əyilirsiniz. Saray əhli heyrətdədir. Əyilmiş başlarını qaldırırlar və təəccüblə mənim üzümə baxmağa başlayırlar. Birdən yadıma düşür ki, bu xəyal belə olsa burada öz davranışımı sərgilədiyim və kral, kraliçaların etməli olduğu kimi etmədiyimə görə bu heyrət yaranıb. Artıq gecdir. Olan oldu. Yəqin ki, bu elə də

ciddi problem yaratmayacaq. Həm də mənə taxta çıxmaq lazımdır o vaxta da marketə çataram və sonrası ilə işim yoxdur...bax belə artıq çatmışam. İnana bilmirəm..yəni doğurdan da belə sıxıcı bir yolçuluğu maraqlı bir taxta çıxma mərasiminə döndərə bilmişdim..marketə daxil oldum. Oradakı yaşlı kişiyə, mən ona Əli baba deyirəm, salam verdim və bir çörək verməsini xaiş etdim. Əli baba çörəyi verərkən mənə dalğın olduğumu dedi. Mən də heç elə belə şeydi dedim. Nəticədə kimə desəm ki, taxta çıxmaqdan gəlirəm gülərdi. Əşi, qoy gülsünlər bəlkə də bir gün çıxdım. Amma həqiqətdə çıxmaq istəməyimdən qətiyyən əmin deyiləm. Dediyim kimi, bura gəlib çıxmaq üçün nəsə bir yol lazım idi o qədər..Əli babadan çörəyi aldım. Bu çörəyə təxminən 70 qəpik verdim. İnsaf naminə çörək heç də kiçik çörək deyildi. Hətta bəlkə indiyə qədər bu qiymətə aldığım ən böyük çörək idi. Əli baba ətrafa baxdığımı görüb dedi ki, nə istəsən götürə bilərsən, Əli baban verir. Mən əlbəttə ki, bu təklifi qəbul edəcək deyildim. Yəni bu mənim üçün qürur məsələsidir. Nəysə, mən bir şey istəmədiyimi sadəcə arxada düzülmüş olan paketlərə yaxından baxmaq istədiyimi dedim. Əli baba təbii ki, buna

etiraz etmədən icazə verdi. Burada partladılmış qarğıdalılara baxmağa başladım. Sonra gözümə başqa şeylər də sataşdı və onları da analiz etməyə yaranmış olan həvəsim məni bir az da orada yubandırdı. Mən bu işlərlə məşğul ikən birdən anamın tez qayıt sözləri yadıma düşdü və Əli babaya təşəkkür edib oradan ayrıldım. Bu yolu gələndə təsvir etməmişdim. Çünki onun yerinə taxtıma gedən yollda idim. Ancaq geri dönərkən vəziyyət tamam başqa idi. Yəni, məndən olsa xəyallar aləmimlə gələrdim. Ancaq görünür xəyallar aləmim bu dəfə mənimlə gəlmək istəmirdi və məni real dünya ilə tənha bufraxmışdı.lap yaxşı. Bəlkə də elə mənə bu lazım idi. Çünki nə vaxtdır ətrafımdakı şeylərə bu qədər diqqət və həvəslə baxmamışdım...marketdən çıxanda ilk qarşılaşdığım şey qapının qarşısındakı bir ağac idi. Yaz vaxtı olduğundan yarpaqları yaşıl idi, özü də çiçəklərlə dolu idi. Bu çiçəklər çox az zaman sonra qırmızı, yaşıl, sarı almalara çevriləcəkdilər. Əlbəttə ki, bu almalar mənə növbəti dəfələrdə bu yolu daha istəkli gəlməyimə əsas verəcəkdilər. Ah, mənim gözəl, şirin, sulu almalarım..heç yeridir, axı, biz də insanıq..ağzımdan ifraz olunan su

dayandıqdan sonra irəliləyirəm. Ağacın yanından sola döndüm buradan sonrakı yol birbaşa evimizə qədər düz gedirdi. Mən gələndə yolda olmayan qoca kişilər qayıdanda yolun sağ tərəfindki heyva ağacınında kölgə saldığı bir yerində oturmuşdular və nəsə haqqında şövqlə söhbət edirdilər. Mən bu dəfə fikirli olmadığımdan ilk olaraq onlara hər vaxtınız xeyir deməyi borc bildim və onlar da məni cavabsız qoymadılar. Yol boyu gülürdüm. əylənirdim. Bir az irəlidə bizim məktəbimiz var idi. Onun həyətinin yanına çatanda hasarın üstündə ətrafa səpələnmiş olan qızılgül kollarını gördüm. Dayandım. Dərindən bir nəfəs alaraq onların ətrini sinəmə doldurdum və yenə gülə-gülə yoluma davam etməyə başladım. Getdikcə həyətlərində ipə paltar asan, çay içən,  qonşularımıza, ağlayan, gülən uşaqlara və onları hər iki halda da sakitləşdirməyə çalışan analarına nəzər salırdım. Hər şey çox gözəl idi. Bəlkə hələ möhtəşəm idi. Nə idi bilmirəm, amma mənə zövq verdiyi dəqiq idi. Hə, bizim evimiz. Artıq çatmışdım. Üstəlik bu dəfə gələndə taxta çıxma mərasimim haqqında da fikirləşməmişdim və hər şey gedəndəkindən daha əyləncəli olmuşdu. Gəldiyim düz yolun demək olar

ki, sonunda sağ tərəfə doğru bir yoğuş qalxır. Orada da bizim evimiz yerləşir. Yoxuşu qalxdım. Yoxuşun başında həyətimizin qarşısında düz bir yer var idi..burada da bir-birinə yapışıq iki söyüd ağacı. Bir az da burada yubanmağın ananmda yaratacağı əsəb dərəcəsinə elə də ciddi təsir göstərməyəcəyini nəzərə alaraq bu ağacları seyrə daldım. Ağacların üstündə iki quş var idi. Mən onlara baxmaq üçün yaxınlaşdıqda biri uçub getdi, ancaq digəri isə yerindən tərpənmədi. Bu quş sarıköynək idi. Mən onun köynəyinə baxdım. Yəni əslində bizim başa düşdüyümüz bir mənada köynəyi də yox idi. Bu məni bir az əsəbiləşdirdi. Axı köynəyi yox idisə, niyə ona sarı köynək deyirik axı..yox, yox, özümü saxlaya bilmədim və sanki mənə cavab verə biləcəkmiş kimi bu sualımı sarıköynəyin özünə verdim...bəlkə də mən yanılırdım..bu qədər xəyal qurmağın axırı...mənə lap yerində olurdu...ola bilməz....axı hələ də..xəyaldır, yoxsa yox? Bəlkə də xəyaldır..amma bu necə ola bilər...üstəlik mənə gülür...bu adı siz mənə vermisiniz mən haradan bilim, çox istəyirsənsə bunu bu adı mənə vermiş olan insanlardan soruş...bu cümləni bir quşun dediyinə

inanmaq? Ancaq niyə də olmasın. Lap tutaq ki, xəyaldır, yenə də mənim xoşuma gəlirdi..üstəlik mənə mənalı-mənalı baxan bu quş deyəsən mənimlə doğurdan danışmışdı... yaxşı, Sarıköynək bu adı sənə biz vermişiksə, belə çıxır ki, sənin bizim bilmədiyimiz bir adın da var? niyə cavab vermirsən. Bax bu dəqiqə cavab ver, yoxsa elə biləcəm ki, bayaq da danışmamısan və mən xəyal görmüşəm. Hə, gözləyirəm..

Eh, dayan görək, nə edirsən mənim adımı, üstəlik adımı bir insana demək mənim üçün o qədər də asan deyil...

Niyə, deyil?..

Siz insanlara güvən olmaz da ona görə...

Amma mənə də olmaz, axı məndən sənə heç bir pislik dəyməz...

Yaxşı, burax mənim bu ad məsələmi..

Əsas sən burada nə edirsən, anan səni çörək almağa göndərməmişdi?

Göndərmişdi, nə olsun. Mən də almışam və bir az burada dincəlirəm.

Dincəlirsən?

Hə, dincəlirəm.

Nədənsə mənə elə gəlir ki, sən gedəndə və gələndə onsuz da yetərincə dincəlmisən. Düz demirəm?

Lap belə deyirsən, bir az da burada dincəlsəm guya nə olar. Dünya-aləm bir-birinə dəyməz ki?

Dünya-aləm dəyməz, amma anan sənin yolunu gözləyir. İndi görəcək ki, gec gəlmisən narahat olmağa başlayacaq.

Yaxşı da, sən mənim anamı məndən çox istəyirsən indi?

Çox istəməsəm də səndən daha yaxşı başa düşdüyüm dəqiqdir.

Necə yəni? Axı sən bir quşsan.

Hə, mən bir quşam, amma ana olan bir quş.

Belə de. Mənə çatanda quşun da ana olmağı tutur. Eybi yoxdur. əgər belədirsə, mən də bunu deməyi özümə borc bilirəm ki, nədir bu çəkdiyimiz anaların əlindən? Durmadan qışqırırlar, uşağı danlayırlar. Bu da azmış kimi biz öz kölələri zənn edirlər. Bu dediklərim haqqında nə fikirləşirsən bəs?

Mən sənin dediklərində fikirləşməyə dəyəcək bir şey görmütəm. Yaxşı, mənə elə əsəbi baxma. Yəni demək istəyirəm ki, məncə bu dediklərində o qədər də haqlı deyilsən.

Deyiləm?

əgər mənə bir zərər verməyəcəksənsə, doğruları deyə bilərəm, yox verəcəksənsə, eybi yox səni tərifləyə də bilərəm..

Eh...yaxşı, düzünü de, heç nə etməyəcəm..başqa birinə də deməyəcm..üstəlik desəm də, heç kim mənim bir quşla danışdığıma və onun da mənə belə şeylərdən danışdığına inanmaz.

Yaxşı, onda qulaq as. Məncə, sən hadisələrin ancaq bir üzünü görürsən. Bu üz isə ancaq özünlə əlaqədardır. Yəni sən ancaq anan sənə get çörək al qismini eşidirsən və onun bunu nə üçün özü yox, sənə tapşırdığını da qətiyyən düşünmürsən. Çünki düşünmək istəmirsən.

Mən istəmirəm? Yaxşı görək də! Sənə nə var orada oturub danışırsan. Mən də bir quş olsam və durmadan səmada qanad çalsam, yəqin ki, sənin kimi özümə vəz verə bilərəm. Hələ onu demirəm ki,

sənin dediklərin tamamilə mənə qarşı haqsızlıqdır. Yəni anam məni durmadan bir iş arxasınca göndərir. Və məncə, istəsə mənim yerimə özü də gedə bilər! Odur ki. Haqsız olduğumu filan düşünüb eləmirəm.

Ha, ha, ha...ey, əziz insan, yenə başlamısan ki, mənim kimi olsa idin..başa düşürəm sən uşaqsan, amma sizin böyüklərin də belə düşünəcəyini güman edirəm...deməli mənim kimi olsa idin, hə? elə bilirsən ki, mənim kimi olmaq asan məsələdir. Yox, əzizim, yox! Sən belə düşünürsən, çünki anana münasibətdə də belə düşünürsən..ona görə səni bu düşüncəndə qınamayacağam..amma anana nə deməli? Onun ki, işşlərinin nə qədər çox olduğunu bilirsən..bilirsən ki, yeməyinizi o bişirir, səni o çimizdirir, evi o səliqəyə salır, paltarlarınızı o yuyur və hə, hətta bəzən səni çörək almağa göndərmək yerinə bu istidə özü çörək bişirir...hə, bunlara nə deyəcəksən..

Nəsə, deyəsən çox şey sadaladın, amma bu sənin haqlı olduğunu göstərməz..nəticədə mən uşağam və ancaq əylənmək istəyirm. Və məncə, bu mənim haqqımdır. Ona görə də heç kimin məni çörək

almaq kimi bir işlə məşğul etməyə haqqı da yoxdur. Həm, mən uşağam nə bilərəm belə işləri..

Bilmirsən deyə əlində çörəklə gəlirsən...

Yaxşı, yaxşı, mənə çatanda quşun da dili açılır və ona cavab çatdırmaq olmur.. bir dəqiqə, indi belə başa düşürəm ki, sən bu məsələlərdə anamın tərəfini tutursan, düzdür?

Tərəfini tutmuram, onu başa düşdüyümü deyirəm.

Hə, yəni mən öz anamı başa düşmürəm də!

Dedim ya düşmək istəmirsən. əgər istəsən düşə bilərsən.

Tutaq ki, istəyirəm, bunu necə edim?

"Tutaq ki" ilə iş keçməz. Mənə dəqiq cavab lazımdır, istəyirsən, ya yox...?

Ah......yəni...bəlkə də..bilmirəm, amma...eh, istəyirəm, vəssalam..

əla.

Nə, əla? İndi başa düşməyimə yardım et. Əslində nəticəni indidən gördüyümü düşünürəm, amma qoy olsun. Bizi başa sal görək ki, nə cür olur ki,bu işlərdə mən yox anam haqlıdır.

Tələsmə! Tələsmə!....mən hər şeyi sənə indicə izah edəcəm....

Gözləyirəm, bir az tez ol...

Nə olar bu tecanlılığını uşaqlığına verirəm, hərçənd siz insanların ümumən belə olduğunu bilirəm, amma nəysə...

İndi bildiklərini bir kənara qoy və mənim bilmədiklərim ilə maraqlan..

Yaxşı, yaxşı, nə olar qoy belə olsun...bunun ancaq bir yolu var, o da budur ki...nə cür deyəcəyimi bilmirəm...

Sabahdan cəh-cəh vururdun, dil-dil ötürdün..nə oldu indi, hə? görürəm indi dilin topuq vurur...

Bunu sən istədin....əgər ananı başa düşmək istəyirsənsə, mənimlə yerdəyişdirməlisən!

Necə? Ha, ha, ha.....zarafatlarını özünə saxla. Mən də durub gözləyirəm ki, doğurdan da bir çarə, yol deyəcək...hı, hı,....hörmətli sarıköynək və ya adın hər nədirsə, bilmirəm, get işinlə məşğul ol..və ya bu zarafatlarınla güldürəcək başqa bir uşaq tap..

Bu zarafat deyil..

Düz, deyirsən, buna qədər zarafat olan şey odur ki, sən mənimlə danışırsan..kim bilir bəlkə də heç danışmırsan. Mən səni xəyalımda danışdırıram..nə də olsa etmədiyim bir iş deyil. Bir az əvvəl sarayım var idi və orada hər kəs mənə təzim edirdi..yəqin ki, sən də bu xəyallarımdan birisən..

Mən yetərincə gerçəyəm..

Sən yetərincə gerçək deyilsən, sadəcə olaraq mən yetərincə xəyalpərəstəm..

Yaxşı görək..özünü aldatma. Sən də çox yaxşı bilirsən ki, hazlırda söyüd ağacının üzərində oturmuş olan və siz insanların sarı köynək deyə adlandırdığınız bir quşla danışırsan..qəbul et, qurtarsın, getsin!

........gözlə, əvvəlcə fikirləşməliyəm..tutaq ki, sən həqiqisən və mən səninlə yerimi dəyişməyə razıyam. Onda nə olacaq?

Necə yəni, nə olacaq. Sən bir ananın yerinə keçəcək və onun hiss etdiklərini hiss edəcəksən...

Qulağa heç də pis gəlmir..yəni sən dəqiq burdasan və mənimlə danışırsan, hə?

Eh, sən hələ oradasan..əgər inanmırsansa, əvvəlcə get anana çörəyi ver sonra yanıma gəl. Həm onda yuxuda olmadığını, xəyal görmədiyini də başa düşərsən..

Hə, bu yaxşı fikirdir. Yaxşı, gedirəm.

Get...

Darvazaya bənzər, lakin tam olaraq darvaza adlandırılması ədalətli olmayan qapıya yaxınlaşdım.. qapını açdım və içəri daxil oldum..həyətdə heç kim yox idi. Həm kimsə olsa mənim bir quşla danışdığımı, və ya danışdığımı zənn etdiyimi görüb yanıma gələrək dəli olduğumu demə zəhmətinə girərdi..evə girdim, anam evdə mənim yerə tökmüş olduğum oyuncaqlarımı toplayırdı...arada bir də özlüyündə bu oyuncaqları yerə tökmüş olan məni danlamaqdan da geri qalmırdı...ancaq insaf naminə arada bir dodoqlarında təbəssümə bənzər bir şeylər də gözə dəyirdi... anamı çağırdım...anam əvvəlcə mənə bir az əsəbi şəkildə baxdı, sonra isə nə fikirləşdi, amma bilmirəm ki nə fikirləşdi, mənə dedi ki, niyə görə bu qədər geç gəlmişəm?....mən də özümündən tam olaraq başa düşmədiyim bir şeylər deyib

vəziyyətdən çıxmağa çalışdım...üstəlik mənim başa düşmədiyin bu şeyləri anamın başa düşəcəyinə isə heç bir şübhəm yox idi...görünür yanılmamışdım və anam məni başa düşdüyünü bildirən bir baxışla mənə baxdı və indi gedib oynaya biləcəyimi dedi..amma nənə və babamın evimizin ikinci mərtəbəsində yatmış olduqlarını da xatırladaraq bir az səssiz olmağımı istədi...hərçənd ürəyimdə səssiz oynayacamsa, bunun harası oynamaq oldu dedimsə də, dilimdə buna çalışacağımı bildirdim və evdən çölə çıxdım...yadıma bir az əvvəlki macəram düşdü. Cəld həyətdən çölə atıldım və söyüd ağacının yanına gəldim..hə, quş orada idi..amma nə olsun, bu hələ özlüyündə mənim bir az əvvəl onunla danışmış olduğumu sübut etmirdi.. ona asta bir səslə, sarıköynək deyə müraciət etdim və cavab gəlib-gəməyəcəyini səbirsizliklə gözləməyə başladım...bir də cəh-cəh deyə bir səs eşitdim və o an yanılmış olduğumu düşündüm.. başımı aşağı saldım..az qala ağlamaq üzərəydim və elə əslində ağlayırdım da...gözümdən yerə ilk göz yaşım düşdükdə “yaxşı, yaxşı, ağlama dedim sənə bir zarafat edim, mən haradan bilim ki, sənin kimi xəyalpərəst biri həm də bu qədər sulugöz ola bilər”

deyə bir səs eşitdim və bunun sarıköynəkdən gəldiyini deməyə isə yəqin ki, ehtiyac yoxdur..hə, yanılmamışdım..mən bu quşla bir az əvvəl doğurdan da danışmışdım...təxminən bir, ya da iki dəqiqə səssizcə bir-birimizə baxdıq..sonra mənim quşum ondan küsməməyi, sadəcə zarafat etdiyini dedi.. mən nə edə bilərdim, kin saxlaya bilmirəm, düzü bəlkə də o an bunu etmək istəyərdim, amma dediyim kimi saxlaya bilmirəm..ona görə də onunla barışdım..nəticə də dərinə getsək ondan heç küsməmişdim də...ancaq incimişdim..yaxşı, indi nə edəcəyik?

İndi mən sənin yanına gələcəm...hə, bax belə...məni əlinə al və ....hə, həyəcanlanma ....sən cəsursan...aha, indi məni ürəyinin üzərinə qoy..

Ürəyim? Sağda... eh, mən nə danışıram sola qoyum?

Hə...afərin indi də gözlərini yum və heç nə haqqında fikirləşmə..sadəcə mənim və özünün ürək döyüntülərimizi düşün...hə...belə...indi gözlərini aça bilərsən...

Açdım..gözlərim..hə, mənim gözlərim...yox, sarıköynəyin gözləri..qəribədir, balacadır, amma

hər yeri görə bilirəm...ha..ha..ha..necə yəni? Mən indi mən deyiləm? Mən sadəcə ....mən mənim qarşımdayam...qarşımdakı mən bir az sonra mənə baxraq gülməyə başladı...təbii ki, mən bunu az da olsa əsəbləşdim ona bəsdir demək üçün ağzımı, daha doğrusu dimdiyimi açaçaqdım ki, bu an əgər bu ağız idisə ağzımdan çıxan "cəh!" kəliməsini eşitdim..qarşımdakı mən bir az daha bərkdən gülərək mənə narahat olmamağımı və onun məni başa düşdüyünü dedi..hə, demək olar ürəyimə su səpmişdi, mən danışa bilmirdim, ya da hamının bilmədiyi bir dildə əslində danışırdım...artıq qarşımdakı mənim əziz quşum sarıköynək, sarıköynəyin isə mən olduğunu başa düşdüm..o mənə dedi ki, indi hərəmiz öz evimizə getməliyik.. hə, mənim evimi tanıyırdı, çünki tam olaraq onun yanında idi. Bəs, mən...mən onun evini tanımırdım, axı!....bunu ona da dedim. O isə mənim sadəcə uçmalı olduğumu və qanadlarımın məni ora aparacağını dedi...hə, eşitdiyim bu kəlmə-uçmaq..əla səslənirdi..ama mən bunu da necə edəcəyimi bilmirdim..qarşımda durmuş olan və mənim yerimə keçmiş olan sarıköynək bunun da özlüyündən olacağını dedi...artıq hər şeyin

mükəmməl olacağını düşünürdüm. Nəticə də kim quşa çevrilib uçmaq istəməz ki? Məncə, hamı istəyər...ilk təcrübəm üçün qanadlarıma uçmaq əmri verdim və hə, mən bunu bacarmışdım..hə, mən uçurdum..əvvəlcə söyüd ağacının üzərinə qondum..sonra göyə qalxdım və mən uçurdum! Sevincim sözün həqiqi mənasında nə göyə, nə də yerə sığmırdı..çox xoşbəxt idim..hər şey çox gözəl olacaqdı..bir az sonra yerdəki mənin yanına enərək artıq buradan uzaqlara uçmaq istədiyimi və onun da öz başının çarəsinə baxmalı olduğunu dedim..açığı mənim cildimdəki quş heç də narahat bir quşa, daha doğrusu bir insana bənzəmirdi..lap yaxşı..mənim üçün bunun bir fərqi yox idi..odur ki, onunla sağollaşıb səmaya qalxdım....mən yüksəldikcə o da mənə baxır və əl sallayırdı.....mən isə uçurdum....bir anlıq mən də ona qanad sallamaq istədim. Hə, nə olardı. İndi səmada olduğum bir vaxtda mən haradan biləydim ki, quşlar bir-biri ilə necə sağollaşır. Elə o an quyruğumun özümdən asılı olmayaraq yelləndiyini gördüm.  Deyəsən mən bilməsəm də sağ ollaşa bilmişdim. Yəni quyruğum nə istədiyimi başa düşmüş və mənim arzumu yerinə yetirmişdi. O

hadisədən sonra belə qərara gəldim ki, nəsə etmək istədikdə onun haqqında sadəcə olaraq düşünəcəm və mənim quş bədənim istəyimi yerinə yetirəcək. əla bir kəşf. Amma hər şey bir yana quş olmağın üstünlüklərindən yararlanmağım tamam başqa bir məsələ idi. Nə də olmasa ilk dəfə idi ki, səmada uçurdum, daha doğrusu uçurdum. Sonra birdən elə düşünərsiniz ki, indiyə qədər də səmada yox, başqa bir yerdə uçmuşam. Yox, yox, bu mənim ilk uçuşum idi. Səmadan yerə baxmağın zövqünü izah edə bilmirəm. Düzdür, hazırkı vəziyyətdə və o vaxt bu hadisə mənim başıma gələndə də artıq təyyarə deyilən bir nəqliyyat var idi. Ancaq birincisi mən bu nəqliyyata minməmişdim və ikincisi də quş olmaq başqa quşa baxaraq ilham alınıb yaradılan təyyarəyə minmək tamam başqa. Bunlar arasında dünyalar qədər fərq var. Aha hərçənd hazırda bir quş olsam da, birdən dediyim bu söz məni cəlb edir. Dünyalar qədər..hansı dünyalar..neçə dünya var ki? Bilmirəm, amma bəlkə də insan olaraq bilmədiyim şeyləri quş olaraq öyrənə bilərəm..kim bilir, bəlkə də..qeyri-iradi olaraq yuxarıya doğru qalxıram..daha da yuxarıya..daha da yuxarıya...və artıq başım buludlara dəyir desəm yalan

olmaz..buradan ətrafa baxıram..yolda, yolda deyəndə göyün üzündəki yolu nəzərdə tuturam, qarşıma bir qaranquş və iki qarğa çıxır..tam olaraq onlara salam verib-verməmək arasında qalmışam və birdən qaranquş qanadlarını qəribə bir şəklə salaraq tərsinə uçurmuş kimi bir şeylər etdi. Bir anlıq onun qarnının yuxarıda kürəyinin altda olduğunu düşündüm. Görünür, bu onun salam vermə şəkli idi. Qarğalar isə başını sağa-sola çevirməyə başladılar. İkisi də eyni vaxtda, yəni təxminən 30 saniyə sonra bu hərəkətlərinə son verdilər..deməli onların dilləri fərqli idi. Aha göyün üzündə də, quşların arasında da eyni dildən istifadə edilmirmiş. Bəs yaxşı mənim dilim nədir..fikirləş, fikirləş..anidən ağzımdan bir uzun cəh-cəh-cəh çıxdı. Mən cəhildəməklə məşğul ikən o quşlar da üzlərində məmnuniyyət əlamətinə bənzər bir şey ilə yanımdan uçaraq keçdilər. Hə, quşlarım salamlaşma mərasimi xoşuma gəldi, amma hərənin ayrı-ayrı dildə salamlaşmağı..bax bu heç olmadı..ancaq bir dəqiqə..yox...mən yanılmırdım..bu necə ola bilərdi..onlar eyni dildə danışmırlarsa belə bir-birinin dilini başa düşürlər? Niyə bu qədər təəccüblənirəm, özüm də

bilmirəm..burada göyün üzündəki bir insan quş olduğuna təəccüblənmir, ancaq quşların bir-birinin dilini bilməyinə təəccüb edir..onu bunu bilmirəm, lakin tək bildiyim şey hazırda təəccüb olunmalı bir şey,, ya da biri varsa o da mənim özüməm...uçuram..buludlar üzümə toxunaraq parçalanır, sanki mənim gəldiyimi görüb mənim üçün yol açırlar...hə yol açırlar. Kim bilir bəlkə bu buludlarında bir dili var..yəqin olsa da onu mən bilmirəm..fikirləşirəm ki, onların da hərəsinin özünəməxsus dilləri var..yəni məsələn laylı buludların dilləri topalı buludlarınkından fərqlənir..hə, bir də göyün üzündə hərdən bir şəklə düşən, gah ürəyə, gah insana, gah ayıya, gah da..eh nə bilim hər şeyə bənzəyən bu buludlar yəqin ki, tamam başqa bir dilə sahibdirlər..niyəsini bilmirəm, ancaq məncə bu buludların dili ən maraqlı, ən gözəli olmalıdır..yaxşı, yaxşı bu heç mənim kimi bir insana, daha doğrusu quşa yaraşan düşüncə deyil, axı hamısının dili özlərinə görə gözəlliklərə sahibdir..yox bir də bunu etməyəcəm..maraqlı bir digər şey də odur ki, bir quş necə ola bilər ki, həm öz dilini, həm də başqa quşların hamısının dilini yadında saxlaya bilir..əla,

görən onların da məktəbi varmı? əgər varsa, dil dərslərini keçmək tərzlərinə mütləq diqqətlə baxmalı və yer üzünə endikdə bunu lazımı şəxslərə deməliyəm..hı, hı..görəsən desəm bir uşağın sözünə qulaq asarlarmı? Bu sualı da bəyəndim..birdən arxamdan bir səs eşidildi..yəni bu yerdəki kimi bir şey deyildi..çevrildim..buludlar mənə baxırdılar..yox, onların sizin təsəvvvür etdiyiniz kimi gözləri yox idi..amma..məndən bunu necə bildiyimi soruşmayın sadəcə baxırdılar..bunu bilin bəsdir..mən də onlara baxmağa başladım..özümün quş dilimdə onları əlimdən gəldiyincə nəzakətlə salamlamağa başladım.. onlar da məni salamlayırdı..buna əminəm..mən onların dilini haradan bilirdim, bax bunu bilmirəm..dəqiq olan şey onları başa düşməyim idi..məndən uşaqlarımı soruşurdular..birdən istədim deyəm ki, mən özüm uşağam siz mənimlə zarafat edirsiniz, az sonra bu səhvi etmədən xatırladım ki, mən hazırda uşaq yox, ailə başçısı olan bir anayam..nə cavab verməli olduğumu bilmirdim...nəsə demək və məndən şübhələnmələrinin qarşısını almaq üçün dedim ki, hə uşaqlar yaxşıdır..sonrasını gətirə bildimmi, yoxsa yox bunu deyə bilmərəm..hərhalda

bu birinci cümlədən sonra cəh-cəh vurmağa başladığımı və sonrasını xatırlamıram...mənim bu çıxışımdan sonra məmnun olmuş buludlar sevincli bir şəkildə gülümsəyərək mənə uğurlu uçuşlar arzuladılar... hər şey əla idi..hə, mən az əvvəl buludlarla danışmışdım..deməli onların da dilini bilirdim..üstəlik onlar da mənim dilimi bilirdilər və biz söhbət etmişdik..uçmağa başlayacaqdım ki, birdən onlara qarşı nəzakətsizlik etmiş ola biləcəyimi düşünərək mən də onların uşaqlarını soruşmaq istədim..birdən onların uşağı yox idisə..birdən..birdən..bu göyün üzündə nə birdənidir.. soruşdum və əvvəldən soruşmamış olduğum üçün onlardan məni üzürlü görmələrini də istədim..buludlar gülməyə başladılar və mənim zarafatımı bəyəndiklərini dedilər...təəccüblənmişdim. axı mən gülməli nə demiş ola bilərdim ki? Birdən bir az əvvəl dediyim kimi ürəyə bənzəyən bir bulud mənə yanaşdı, o da gülürdü və dedi ki, bizim övladlarımız olmaz..biz burada bir-birimizin dostu kimi yaşayırıq və günün sonunda da biz ölürük, sabah yeni buludlar doğulur...sonra da bunu mənim ki bildiyimi və sualımın yersiz olduğunu dedi..onun dediklərindən

sonra mənə də sualım yersiz görünürdü..buna şübhə yox idi, amma bu nə demək idi? Onlar axşam öləcəkdilər və mənimlə belə gülüb-əylənərək danışırdılar?...hə, hələ onu demirəm ki, əgər onlar hər axşam ölür və yerlərini də başqa buludlara verirlərsə, deməli onlar özü də dünən ölən buludların yerinə bu gün doğulmuşdular, bəs yaxşı onda məni haradan tanıyır və üstəlik uşaqlarım olduğunu da bilidilər? İş orasında deyil, soruşaram, ancaq bu dəfə məni tamam ağılsız hesab edə və daha bərkdən gülə bilərlər..yox, buna razı ola bilmərəm.. amma nəsə etməliyəm..hə, bu dəfə mən də zarafat edirmiş kimi dedim ki, tutaq ki, mən sizin uşağınızın olmadığını bilmirəm, yaxşı siz haradan bilirsiniz ki, mənim uşaqlarım var?  bu sözlərdən sonra dimdiklərim bir-birinə dəyməkdən qırılana qədər gülməyə başladım..hə, tamam ilə səfehlik etdiyimi başa düşüb cəld gülməyimmi dayandırdım...buludlar gözlərini mənə zilləmişdilər..birdən onlar da gülməyə başladılar..və dedilər ki, onlar doğulduqda ölən buludların yaddaşları yeni doğulan bu buludlara verilir və bu işdən bütün səma əhli xəbərdardır.. döş qəfəsimdə yerindən çıxacaqmış kimi döyünən

kiçik sarıköynək ürəyimdə fikirləşdim ki, mən yazıq haradan bilim mən ki, səma yox yer əhliyəm..ancaq təbii ki, bunu onlara demədim və dimdiklərimə gülümsəməyə bənzər bir ifadə verərək dedim ki, bunu mən də bilirdim, sadəcə onlarla zarafat etmək istədim..buludlara əgər belə demək mümkünsə, ağızlarını açmağa imkan vermədən dedim ki, balalarım məni gözləyirlər, odur ki, tez evə getməliyəm. Bunu deyib sağollaşdım və uçuşumun istiqamətini seçərək sürətlə ətrafıma baxmadan irəliyə doğru buludların arasına sonra da aşağıya qanad çalmaqdaydım. Arxamdan buludların yaxşı uçuşlar dediyini eşidirdim...uçmağa davam etdim...nəhayət ağacların çox olduğu bir yerdə tamam ilə yerə enməyə qərar verdim və oradakı bir ağacın üzərinə qondum.. buranı kiçik meçə də adlandırmaq olardı. Mənim üzərində oturduğum ağac cır armud ağacı idi. Bu ağacın üzərindəki cır armudlara baxdıqda acımış olduğumun fərqinə vardım. Üstəlik çox acımışdım. Həm də çox..amma insan olduğum vaxtlarda bu armudların dadına baxmaq üçün onlardan xeyli toplamış və paltarımın ətəyində evə gətirmişdim. Yerə tökdüyüm armudlardan birini

götürüb yemək üçün aldığım tək bir dişdək belə nə qədər səmərəsiz bir iş görərək bu armudları toplamış olduğumu başa düşməyimə səbəb olmuşdu. İndi quş olduğum bir vaxtda da vəziyyətin belə olacağını düşünürdüm..artıq işin işdən keçdiyini və aclığın mənə güc gəldiyini nəzərə alaraq hər şeyi unudub gözümə ən xoş gələn bir armudun üzərinə atıldım və dimdikləməyə başladım..aha..bu heç də pis deyildi..hətta çox ləzzətli idi..bir az o tərəfə keçərək bunu həyətimizdə bitən armuddan daha ləzzətli olduğunu belə deyə bilərəm...demək insan ikən acı bildiyim və buna görə zibilliyə attığım bu armudlar quş olarkən mənim ləzzətli yeməyim halına gəlmişdi..maraqlı idi..bir də onda baxdım ki, armudun hamısını yeyib qurtarmışam. Və üstəlik bir armudla doymuş olmağım məni həm heyrətləndirir, həm də əsəbiləşdirirdi. Niyə əsəbiləşdirirdi? Dəqiq bilmirəm, amma yəqin ki, bu insan olduğum vaxtlardan qalan bir tərəf olmalı idi. Qarnım doymuşdu, gözüm isə hey ağacdakı digər armudlara baxır və niyə bu qədər tez doymusan deyə qarnıma qarşı üsyan edirdi...günorta olmuşdu. Günəş məni yandırmağa, həm də

susatmağa başlamışdı. Hə, indi də su tapmalı idim. Mən bu ağacların harada olduğunu bilirdim. Yəni insan olarkən də bura gəlmişdim. Ona görə də yaxınlıqda bir çayın olduğundan da xəbərdar idim...bu çaya doğru yol almağa başlamışdım belə...ağacın üstündən yuxarıya doğru qalxdım..bir az da yuxarı..və buradan sonra düz istiqamətdə uçurdum..göydən yerə baxdıqdı ağacların olduğu yerdən artıq çıxdığımı və bir düzlüyün üzərində uçduğumu gördüm. Yenə də uçdum. Təxminən 50 metr sonra yerə baxdıqda suyun üzərində olduğumu başa düşdüm. Enəməyə başladım və çayda bir daşın üzərində oturdum. Bu daş suyun üstündə idi, ona görə də mənbəyindən bura doğru axan su bu daşın üzərindən keçə bilmirdi. Daşın üzərində oturmuş olan mən də, kiçik bir quş olan mən də yuxarıdan aşağıya doğru gələn bu axının şiddətindən qurtularaq ətrafıma baxmaqla məşğul idim. Birdən bura niyə gəldiyimi xatırladım..susamışdım..necə, indi su içmək üçün bu daşın üzərindən suyun içinə girməli idim? Hə, nə olar, girərəm, susuzdan ölməkdən daha yaxşıdır. Yəqin ki, suda boğulmaq kimi bir təhlükə ilə üzləşsəm qanadlarım köməyimə çatıb məni oradan

çıxardar. Qərar qəbul edildi, suya giririk...artıq sudayıq..suyun üzərində qanadlarımı o tərəf bu tərəfə doğru yellədərək addımlayıram. Hə, uçmağa ehtiyac yox imiş, mən məgər suyun üstündə yeriyə bilirmişəm də xəbərim yox. Əla! İnsan, yəni özüm, bəlkə də qeyri-özüm bilmirəm, axır kimsə olanda suya girməyə qorxurdum. Fikirləşirdim ki, birdən su məni axınına qarışdıraraq aparar. Boğularam. Amma bəlkə də aparmazmış. Sadəcə mən bir az qorxub elə fikirləşmişdim. Yəqin mən mən olanda kimsə mənə desə idi ki, qorxma sənin qanadların var, əgər nəsə olsa qanadların sənin köməyinə çatıb sudan çıxardacaq, düşünürəm ki, onda heç şübhəsiz rahatlıqla bu suya girərdim. Üstəlik inanıram ki, heç onda da boğulmazdım...nəysə, nəysə, əsas odur ki, indi suyun üstündə gəzirəm. Amma niyə üstündə sadəcə gəzirəm? eh, məndə ağıl qalıb ki? Axı su içmək istəyirdim. Su içirəm..dimdiklərimin arasından mədəmə doğru su yavaş-yavaş axır...bir dəqiqə mən niyə göyə baxmıram? Axı bizim toyuqlarımız, onların balaları həmişə su içəndə göyə baxırlar. Nə olar? Yəqin ki, quşlar baxmır. Doğurdan da niyə görə baxsınlar ki? Toyuqlarımız uça bilmir deyə göyün həsrətini çəkir

və bir gün bəlkə də uça bilmək arzusu ilə durmadan hər qurtum sudan sonra göyə baxırlar. Kim bilir, bəlkə hələ bir gün mütləq uçacaqlarına da söz verirlər. Ancaq quşların buna ehtiyacı yoxdur. Onların evi onsuz da oradır. Hə..hələ onu demirəm ki, bu şəraitdə onlar biz insanlar da daxil olmaqla yerdəki bütün canlılara yuxarıdan aşağı baxmaq kimi üstünlüyə də sahibdirlər..eh..., yenə başladım.. bəzən özüm-özümü tamam hövsələdən çıxardıram...sudan doyunca içdim. Doyunca içdim deyəndəki burada da doyduğuma qətiyyən əmin olmadığım kimi mədəmə qarşı da kifayət qədər əsəbiyəm. Nəyə görə olacaq, çünki cəmi üç qurtumdan sonra, bəli səhv oxumursunuz cəmi cümlətanı üç qurtumdan sonra doymuşdum. Ayaqlarımın altında, yəni ayaq deyəndə nəyi nəzərdə tutduğum yəqin ki, aydındır, durmadan axan bu sudan sadəcə olaraq üç qurtum içməklə doyub əl çəkmək?! Mənim yerimdə kim olsa, əsəbləşərdi. Artıq olan olub. Görünən odur ki, bədəninə daxil olduğum bu sarıköynəyin qarnı o qədər də böyük deyil. Nə olar?....bu nədir? Mənim sarı köynəyim, deyəsən bir az kirlənib, hə, hə, kirlənib. Nə edək? Suya hücum!...ah, ah…gərək o

qədər də bərk hücum etməyə idim. Mən suyun bağrını yarmaq yerinə deyəsən, o mənim sinəmi yarmışdı...suyun altındayam. Daşlar görürəm. Yöx, yox, təkcə daşlar yox, balıqlar da görürəm. Bu balıqlar məndən heç də kiçik sayılmazlar...bəziləri boz, bəziləri bir az qara, bəziləri isə tamamilə fərqli bir rəngə, yəni məncə yaşıla çalırdılar. Mənim əziz balıqlarım..mənim sevimli balıqlarım..

Nə istəyirsən **Sarıköynək**?

Bu nədi? Nə badə bu dəfə də bir balığın mənimlə danışdığını demə! əlimdən bir şey gəlmir, deməliyəm. Özüdür ki. Var. Bir az öncə yaşıla bənzədiyi üçün heyrət etdiyim balıq mənimlə danışırdı..nə cavab verə bilərdim? Ona onlara heç bir narahatlıq vermək fikrimin olmadığını bura sadəcə çimmək məqsədi ilə baş vurduğumu dedim. Birdən balıqlar gülməyə başladı..hə, buludlar az deyilmiş kimi, indi də balıqların gülüşlərinə məruz qalmışdım. Sadəcə ona təəccüb edirəm ki, niyə görə ağaclar mənə gülməmişdi. Bəlkə də mən armudları yeməklə məşğul ikən onlar yatmışdı..

Niyə gülürsünüz?

Heç nəyə. Sadəcə sənin belə qorxmağın bizi təəccübləndirir.

Necə yəni? Başa düşmədim....axı mən sizin evinizə gəlmişəm və sizə narahatlıq vermişəm...əla, yenə gülməyə başladılar. Bircə bu çatışmırdı..suyun altında balıqların gülüş hədəfinə çevrilmiş və çıxılmaz vəziyyətə düşmüşdüm...

Necə yəni, başa düşmürsən. Bura həm də sənin evindir.

Doğurdan?

Əlbəttə ki, doğurdan.

Yəni mən istədiyim vaxt bura gələ bilərəm. Üstəlik icazəsiz?

Dedim ki, əlbəttə. Axı bu nə qəribə suallardır verirsən.

Bu dəfə tamam çətinə düşmüşdüm. Hə, niyə bu sualları verirdim? Niyə? Niyə?...tez bir şey fikirləşməliyəm. Ancaq verəcəyim cavab onlara aydın olmalıdır..əslinə qalsa belə düşünməyimə səbəb o idi ki, bizlər də deyilənə görə hər bir xalqın, yəni bunu dəqiq başa düşmürdüm, amma ehtimalıma görə bizimlə eyni dildə danışmayan,

eyni şəkildə geyinməyən insanlar idi bunlar, öz evi kimi bir şey var və biz ora girə bilmərik. Bilmirdim niyə? Sadəcə mənə belə demişdilər. düzünə qalsa, məncə burada qəribə bir şey yox idi. Axı bu yerləri biz yaratmamışdıq. Bu ağacları, bu suyu biz yaratmamışdıq. Necə ola bilərdi ki, mən mənə öyrədilmiş olan o insanlardan birinin burada olan ağaclara baxmasına icazə verməyə idim? Necə ola bilmirəm, ancaq bildiyim bir şey var idisə, o da artıq olanın olub keçənin də keçdiyi idi. Hə, bir də onu bilirdim ki, əgər bu düşündüyüm boş və əsassız şeyləri balıqlara desəm, onların növbəti gülüş yığıncağı ilə qarşılaşmağa hazır olmalıyam. Hələ onu demirəm ki, birdən onların da ağlına batsa, indi məni elə buradaca gözümün yaşına, yəni əgər vardısa, baxmadan öldürə də bilərdilər. Hər iki halda da vəziyyətin mənim əlehimə dəyişəcəyini düşünərək bu düşündüklərimi demədim. Və nəhayət məcbur qalıb burada da buludlara dediyim yalanı, onlarla zarafat etdiyimi deməli oldum. Təbii ki, bu zarafatın nə səbəbini, nə də mənasını başa düşməsə də, balıqlar artıq bir söz demədilər...bundan sonra hal-əhval tutmağa başladılar. Evdəkiləri soruşdular. Mən də əvvəlki

qayda ilə cavab verdim. Ancaq doğurdan da görəsən evdəkilərin vəziyyəti nə yerdə idi, bunu özüm də bilmirdim. O anda bu adı çəkilən evin, yəni mənim evimin yerini tapmalı olduğumu xatırladım. Nəzakət naminə onlardan da uşaqlarının necə olduğunu soruşdum. Onlar əgər insanlar bir müddət də toxunmasa, yaxşı olacaqlarını deyəndə bir an ürpərdim. Axı bu haqqında söhbət gedən və bu balıqlara vaxtı ilə rahat verməmiş olanlardan biri də mən idi. Dimdiyimi də başımı da aşağı saldım. Tez evimə getməli olduğumu dedim və sağğollaşıb sudan çıxdım.  Sudan çıxar-çıxmaz iki şeyin fərqinə vardım. Birincisi uzun müddət suyun altında qalmağıma rəğmən boğulmamış olmağım idi. İkincisi də o idi ki, mən təkcə hər növ quşun, buludların yox, həm də balıqların dilini bilirdim. Hə, bilidim, amma bu dilləri izah etməyimi məndən istəməyin, çünki izah edə bilməyəcəm.... Bu sonuncu fikir məni tamam heyrətləndirdi. Çünki bu fikir onu göstərirdi ki, təbiətdə bütün canlılar bir-birilərinin dilini bilirmişlər. Bəs yaxşı? ....insanlar da bu təbiətdə yaşamırdılar? Axı biz niyə onların dilini bilimirdik? Və əgər bir təsadüf nəticəsində mən sarıköynəklə yerimi dəyişməmiş olsam, mən də heç

vaxt bilməyəcəkdim.....artıq günortadan keçirdi..hə, evim..o anlarda daxilimdən bir səs, onu da deyim ki, bu səsi indiyə kimi qətiyyən eşitməmişdim, mənə evə getməli olduğumu deyirdi.....yenə qeyri-iradi olaraq əvvəldə armud yediyim yerə doğru uçurdum. Birdən yadıma düşdü ki, əgər mənim balalarım varsa, onlar da indi ac olmalıdırlar. Odur ki, onlara yemək aparmalıyam. Ancaq nə? görən onlar da bu armudlardan yiyə bilərdimi? Bunu yoxlamadan bilə bilməzdim. Ona görə də həmin ağacların tam üzərində aşağıya doğru enməyə başladım...endim..endim..və yenə o armud ağacının üzərinə oturdum..bir də öskürək səsi eşidildi..yenə eşidirdim..eşitməyə davam edirdim..ardıcıl eşidilən bu öskürəklərin ardından bir asqırmaq səsi gəlidi..ancaq çox yaxından gəlidi..sankki lap altımdam..lap altımdan?...qorxduğum başıma gəlmişdi. Doğurdan da bu ağaclar da danışırmış..yəqin ki, mənim təxmin etdiyim kimi əvvəlki gəlişimdə yatmışdılar...

Sevimli sarıköynək, axı niyə bir az ehtiyatlı qonmursan?

Mən?..necə?....hə, üzürlü sayın, mən bilmədim, yəni sizi narahat etdiyimi...

Ha, ha, ha..nə olub sənə? niyə belə həyəcanlanırsan? Sən ki, bizim səni nə qədər sevdiyimizi yaxşı bilirsən. Sənin bizi sevməyin isə bizə çoxdan məlumdur.

Hə, hə, əlbəttə ki sevirəm..sus ürəyim, sus, nə deyirsən? meşədə səni görüb danlayacaq heç kimin olmadığını düşünərək bu ağacların yarpağını qopardan mən deyildim?! Yaxşı, sus deyirəm sənə. O mən deyildim, daha doğrusu o mən idim hazırda mən mən deyiləm, **Sarıköynəyəm**.....sevimli ağac, sənin meyvələrindən dərib balalarıma apara bilərəm?

əlbəttə apara bilərsən! Bu nə sözdür.

Yəni heç bir qarşılıqsız?...əlbəttə ki, bunu ürəyimdə demişdim..armudlardan birini dərmək üçün yanaşdım.

Dünənə görə sağ ol.

Nə? yəni tam olaraq nəyi nəzərdə tutursan?

Dünən mənim budaqlarıma qonaraq oxuduğun mahnı üçün sağ ol deyirəm.

Hə, onu deyirsən..nə haqqında danışdığını bilməsəm də dəyməz dedim....kim bilir, onun qazancı da bəlkə budur....dəqiq olan şey isə bunu mənim, yəni Sarıköynək olan mənim qarşılıq üçün yox, öz zövqüm üçün etmiş olmağımdır, çünki bu quş ürəyi harada nə vaxt istəsə oxuyur.....armudu qırmaq üzərəyəm...bir daha sağ ol dedim..armudu budağından qopardım və dimdiyimlə tutaraq sağollaşdım....artıq səmadayam..yenə də uçuram...uçuram. uçduqca da ətrafıma, yerə baxıram...hara getdiyimi mən də bilmirəm, amma gedirəm..düşüncəmə görə bu dəfə gedəcəyim yer evim, ailəmin yanı olmalı idi...və mən hələ də uçurdum...iş uçmaqda deyildi, hara və niyə uçmaqda idi. Görünür hələ də uşaq ruhum öz yerində və iş başında idi. Ona görə də dimdiklərim arasında olan armud, yuxarıdan yerə baxarkən gördüyüm bostan, bostanın içərisində balaca quş gözümə dəyən təzə əkilmiş şitillər, irəlilədikcə lələklərimin arasında hiss etdiyim hava, mavi səma, qısası bir quşun uçarkən görə biləcəyi gözəl bir kənd mənzərəsi məni məndən alırdı. Bir ara ağzım, daha doğrusu dimdiklərim açılacaq kimi oldu və az qala armud yerə düşəcəkdi. Amma yox, mən cəld

tərpənmiş və bunun olmasına da imkan verməmişdim..uçurdum..bu mənzərənin içində durmadan uçur və yenə də uçmaq istəyirdim. Ancaq hara uçmaq məsələsi yenə də tam həll olunmamışdı. Birdən ağlıma gəldi ki, yenə əvvəlki dəfələrdəki kimi sadəcə hara uçmaq istədiyimi düşünməli və bunu arzulamalıyam, vəssalam. Gerisini daxildən gələn, bəlkə də hər heyvan da olan o instinkt həll edəcəkdi...belə də etdim. Nəticə əlbəttə ki, mənim gözlədiyim kimi olmuşdu. Nə də olmasa sınaqdan keçirilmiş bir təcrübə idi...bir azdan kəndimizdə olan bir evin yanına gəlmişdim. Burada nə işim var idi. Eh, bax bu olmadı. Mən yuvamın meşədə olmasını, hətta ağ olmazsa bəlkə də səmada olmasını xəyal edirdim. İndi isə yenə də evlər..evlər..harasa uçuram..bu tamamən qeyri-iradi olur. Daxilimdən nəsə uç deyə əmr edir. ...heç nə bilmirəm, amma durmadan uçuram..bir müddətdə artıq bu evin həyətinə, daha dəqiqi bağı deyə biləcəyimiz hissəsinə daxil olmuşdum. Buna da şükür deməli yuvam evin damında yox buradakı bir ağacda idi..bu da bir şeydi..həyətdəki heyva ağacına yaxınlaşıram, uçuram və aha artıq heyva ağacı ilə olan qovuşma anımız..yox, bu təkcə heyva

ağacı ilə deyil, həm də mənim ailəm ilə olan qovuşma anım idi. Mənim əziz quş balalarım..məni görən kimi cəh-cəh vurmağa başladılar. “Lar” deyirəm çünki mənim nə az nə çox üç balam olduğunu öyrəndim. Mənə baxırdılar. Belə başa düşdüm ki, məni gördükləri üçün çox sevinmişdilər. Təxminlərimə görə onlar o qədər də kiçik deyildilər. Hətta bəlkə istəsələr  bu gün belə uça bilərdilər. Dimdiyimdəki armudu görüb cəld onun üstünə atıldılar. Hə, mənim balalarımın iştahı tam yerində idi. Qısa zaman sonra armudun tumlarını belə axtarmaq əbəs idi. Onların bir an toxumları yemiş ola biləcəyini və bunun onlara ziyan vurma ehtimalını düşünərək həyəcanlandım. Çünki bizlərdə evdə yaşı kiçik olan uşaqlara bu toxumları yeməmələrini əmr edirlər...eybi yox, əgər yemişdilərsə belə onların vəziyyəti çox yaxşı göründüyündən bu məsələni problemə çevirmədim..yeməklərini yedikdən sonra onlarla oynamaq istəyirdim. Ancaq necə? Görəsən quşlar öz aralarında necə oynayırlar?...bir dəqiqə.... əziz balalarım artıq məsələni çoxdan həll etmişdilər. Sıra ilə cəh-cəh deyirdilər. Mən bu cəhlərin mənasını başa düşürdüm. Çünki əvvəldə də

dediyim kimi mən bu dili burada izah edə bilməsəm də bilir və anlayırdım. Hətta bu dildə danışırdım da..odur ki, balalarımın bir az sonra məni də oynamaq üçün çağırdıqlarını duydum. Maraqlıdır. Görəsən bu necə bir oyundur?.....oyun təxminən belə idi ki, birinci quş mən ikinci səni, üçüncü isə sevirəm deyəcəkdi və sonda da mən bu sözləri birləşdirəcəkdim və cümləni bütöv olaraq, yəni “ mən səni sevirəm” şəklində səsləndirəcəkdim. ən sonda isə hamı bir ağızdan mən səni sevirəm deyə oxuyacaq və qanadlarımızı bir-birinə birləşdirəcəkdik. ..bu o qədər də pis səslənmirdi. Həm oynadıqdan sonra təəssüratlarım yanılmadığımı da göstərmişdi. Nəticədə mən onlara onlar da həm bir-birilərinə, həm də mənə məni sevdiklərini demişdilər. Bu hissi çox bəyəndim. Və artıq hər gün bu oyunu onlarla oynaya bilərdik....birdən bundan sıxılacağımı düşünsəm də cəld bu düşüncələrimi beynimdən silməyə müvəffəq oldum. Asan deyildi, amma oldum...mən balalarımla bu kimi əyləncələrlə məşğul ikən mənim yaşlarımda bir Sarıköynəyin yuvaya doğru gəldiyini gördük. Balalarımın onun qarşısına atılmaları və ata deyə səsləmələrindən

başa düşdüm ki, bu mənim....yəni..nəysə..məncə sizə yetərincə məlum oldu..11 yaşlı biri üçün bunun özü də ayrı bir macəra idi. O dimdiyində meyvə yox, su gətirmişdi. Bu suyu çaydan gətirdiyini dedi. Yəni bütün yol boyu bir dəfə də olsun dimdiklərini aralamadan o suyu bura balalarına gətirmişdi...hə, ancaq öz aramızdır mən də armudu elə demək olar ki, bu ehtiyatla gətirmişdim..artıq onunla bir ortaq tərəfimizi tapdım belə..bir az sonra balalarımız yenə bir az öncəki oyunu təkrarlamaq üçün bizə baxırdılar. Bu baxışlar da gəlin, gəlin, oynayaq ifadəsi var idi. Hə bir də bu ifadələrə heç cür etiraz etmək mümkün deyildi. Elə ona görə də mən, o üç balaca və artıq olan olub keçən də keçib, mənim ərim birlikdə az öncə təsvir etdiyim oyunu oynamağa başladıq. Tək fərq bu dəfə oyuna ərimin də qatılmış olmağı idi. Sonda səsimiz çox yüksəkdən çıxdığı bir anda yuvamızın içərisinə düşən bir daş bizi susdurdu. Mən başımı yuvadan çıxarıb baxdıqda bu daşın bura heç də öz-özündən düşmədiyini, onu bura ev yiyəsinin 5, ya 6 yaşlarında olan oğlunun atdığını gördüm. Niyə atmışdı? Düzü bunu bilmirəm, açığı onun da bilmədiyinə əminəm. Sadəcə bu sözləri dediyini

xatırlayıram: görərsiniz mən sizin hamınızı tutacam, onda sizə göstərərəm. Hünəriniz varsa, onda da belə cəh-cəh vurarsınız. Gözləyin. Mən sizin kababınızı yeyəndə sizə deyəcəm!" ....Hə, o eyniylə belə dedi və getdi. İnsanlar bizim dilimizi bilməsələr də biz onların dilini bildiyimizdən, bunu mən də elə tam olaraq o an öyrənmişdim, onun bu sözləri bizi həyəcanlandırdı. Xüsusi ilə də balalarımızı..ağlamağa başladılar. Ana, o bizi yemək istəyir, nə olar bizi ona verməyin deyə durmadan ağlayır və mənim və atalarının qanadları altına sığınırdılar. Bu halı gördükdə mənim də gözümdən bir damla yaş axdığını xatırlayıram..və sonra başqa bir şey xatırlamış olduğumu da xatırlayıram..hə, keşkə xatırlamaz olaydım...xatırladığım şey o idi ki, təxminən bir il öncə mən də bir sərçəni belə hədələmiş və üstəlik hədələməklə də qalmayıb qurduğum tor vasitəsi ilə onu tutaraq bişirib yemişdim....deyirəm də, keşkə xatırlamaz olaydım..birdən balalarımdan birinin səsi məni bu düşüncələrdən ayıltdı. O mənə axı biz ona nə etmişik ki, o bizi sevmir dediyini xatırlayıram. Hə, belə demişdi. Bu sualdan sonra özlüyümdə fikirləşməyə başladım ki, bəs o sərçə mənə nə

etmişdi? Cavabını özümün də bilmədiyim bir suala axı necə cavab verə bilərdim..odur ki, söhbəti dəyişdim, onun bizə heç bir şey edə bilməyəcəyini dedim. Az sonra yuvamızda tamam bir sakitçilik hökm sürürdü. Birdən ərim başqa bir yerə köçməli olduğumuzu dedi. Mən düşünmədən onun bu fikri ilə razılaşdım və həttə yeni yuvamızı bu gün armudu qırmış olduğum meşədə qurmağı da təklif etdim. Təklifim etiraza yer vermədən ev əhli tərəfindən qəbul olunmuşdu. Ev əhli deyirəm, çünki biz ailəliklə bu qərarı birgə vermiş və balalarımızın da bizimlə razı olduğuna əmin olduqdan sonra köçmək işini dəqiqləşdirmişdik...vaxt itirmək olmazdı. Xüsusən mən onları bir az da tələsdirirdim. Nə də olsa onların arasında o uşağın nə qədər ciddi olduğunu və dediyi şeyi ən yaxın bir zamanda həyata keçirə biləcəyini məndən yaxşı heç kim bilə bilməzdi...ancaq bunun üçün balalarımıza uçmağı öyrətməli idik..İşə qoyulduq. əvvəcə içlərindən ən böyük olanına uçmağı öyrətməyə başladıq. Bunun üçün aşağıda heç kimin olmadığına əmin olduqdan sonra ərimlə mənköməkləşərək onu aşağı endirdik...bu arada onu da deyim ki, bu 11 yaşlı bir

uşaq üçün həqiqətən də çox fərqli bir təcrübə idi. Yəni ərim, uşaqlarım..bunları deyirəm..sonra elə bilərsiniz uçmaqdan quş olmaqdan danışıram, yox, yox bunlar artıq o qədər də qəribə deyildi, mən quş həyatıma alışmışdım. Artıq bir quş olduğumu qəbul etmişdim....sadəcə hələ də uşaqlarımın, ərimin olması..bunlar...amma bunlar da balamıza uçmağı öyrədərkən adi görünürdü. Biz bir-birini çox sevən, çətin anda bir-birinin yanında olan çox yaxın dostlar kimi idik. Və aha belə dostların vəzifəsi biri yıxılanda digərinin onu qaldırmasıdır. Odur ki, bizim balamızın neçə dəfə yıxıldığını, sonra yenidən durduğunu, sonra yenidən yıxıldığını və hər dəfəsində də bizim ona səbirlə yardım edərək qanadlarından tutub qaldırdığımızı xatırlamıram belə. Niyə xatırlamıram? Çünki o qədər şeyin içərisindən təkcə bir hadisə, nəhayət bu balamızın uça bilməyi, digər bütün şeylərin yerini tutmuşdu. Biz bu qayda ilə digər iki balamıza da uçmağı öyrətdik. Təxminən iki-üç saat sonra sonra hər üçü səmada uçurdu. Lakin bu təxminidir, yoxsa quş olan mən saat kimi bir şeyi özümə yük etmədiyimdən bunu dəqiqliyi ilə bilə bilməzdim... səmadan bizə qanad sallayaraq necə xoşbəxt

olduqlarını göstərməyə çalışırdılar. Hərçənd onların xoşbəxtliyini üzlərindən görməmək mümkün deyildi. Yerə endilər...bizə təşəkkür etməyə başladılar. əlbəttə onların bu sevinci kifayət idi və təşəkkürə ehtiyac yox idi...ancaq orada çox qala bilməzdik. Ona görə də cəld hazırlığa başladıq. Hazırlıq deyəndə nəzərdə tutduğum sadəcə olaraq yola düşməyimiz, daha dəqiqi göyə çıxmağımız idi. Çünki bizim heç bir yükümüz yox idi. Yorğan, döşək, yastıq, qab-qacaq, məişət əşyaları, paltar və hətta yemək tədarükü...hə, quş olmaq əla idi. Özümüzə heç bir şeyi yük etməyə məcbur deyildik. Hətta paltarlarımız belə daim əynimizdə olan və özümüzə yük ediləsi bir şey deyildi..dediyim kimi bu möhtəşəm bir hiss idi.. balalarımız uçmağı yeni öyrəndikləri üçün tez-tez yorulur və dincəlmək üçün bizə müraciət edirdilər. Biz isə onların doğurdan da bu qədər uzun yolu getməyə qanadlarının gücünün çatmadığını bildiyimiz üçün onlar bizə hər müraciət etdiklərində səbirlə dayanır və dincəlmələrini gözləyirdik....bu dəfə dincəlmək üçün dayandığımız yerə yaxınlıqda uşaqlar gözə dəyirdi..hə, yenə uşaqlar. Cəld buradan getmək

lazımdır. Bunu ərimə də dedim. O heç düşünmədən insanların olmadığı bir yerə getməli olduğumuzu deyərək mənimlə razılaşdı. Biz yenə uçmağa başladıq.  Uçurduq. Uçduqca yerə baxırdım. İnsanlar bizdən aşağıda qalmışdılar. Buradan onları seyr etmək xoş idi..birdən ərimin tez olun yolun üstündəki ağacın üzərinə qonun dediyini xatırlayıram. Mən ondan niyəsini soruşduqda məlum oldu ki, burada əlində silah olan bir ovçu var imiş. Ərimin  təlaşını görərək ona qulaq asıb ağacın üzərinə qondum. Hə, başa düşmüşdüm. Bir vaxtlar o qədər də əhəmiyyət vermədiyim bu peşə indi mən və ailəm üçün ölüm-dirim məsələsi idi. Qəribədir. Görəsən, bunun haqqında əvvəllər nəyə görə düşünməmişdim?! Biz burada yarpaqların altında gizlənməyə çalışırdıq. Amma sözün həqiqi mənasında sadəcə olaraq çalışırdıq. Bu yarpaqlar o qədər də sıx olmadığından gizləniləsi yer də yox dərəcəsində idi. Bir anlıq fikirləşdim ki, ovçu bizim kimi balaca quşları nə etsin o yəqin ayı, ceyran ovlamaq fikrindədir. Lakin təəssüflər olsun ki, ovçunun bizim gizlənməyə çalışdığımız ağaca doğru yaxınlaşdığını gördükdə bu fikirlərimdən cəld bir şəkildə əl çəkərək ərimə doğru çevrildim və ağacın

ən təpə nöqtəsində balalarımızı qanadlarımızla müdafiə edərək  gözləməyi təklif ettim. O indi uçmağın ancaq ovçunun işini asanlaşdıracağını nəzərə alaraq təklifimi  qəbul etdi....ağacın ən təpəsindəyik. Açığı buradan ətrafı seyr eləmək başqa vaxt olsa idi tam yerində olar və insana, nə fərqi var bir quş olan mənə zövq verə bilərdi, ancaq iş orasında idi ki, insan da olsan, quş da olsan heç bir fərqi yoxdur, can şirin şeydir.  Mən üstəlik tək öz canımın yox, həm də balalarımın və ərimin də canının hayında idim. Qısası, həm özüm, həm də ailəm belə bir halda ikən bu mənzərəyə baxmağa heç bir haqqım yox idi. Amma bunu fikirləşirdim ki, axı niyə, biz bu ovçuya nə etmişik, bizim də yaşamaq haqqımız yoxdurmu? Sonra özlüyümdə yenə fikirləşirdim ki, əgər bu sualı ovçuya versəm o da deyəcək ki, bəs bizim yaşamağa haqqımız yoxdurmu, mən səni öldürüb evdə ac məni gözləyən balalarıma aparacam. Hə, onun bu cavabı verəcəyindən əmin idim. Görəsən belə olan halda hansımız haqlı olarıq? O, yoxsa biz quşlar? Kim bilir? Bəlkə ikimiz də haqsızıq, bəlkə də ikimiz də haqlıyıq. Bu qəliz məsələdir. Mən kiçicik quş beynimə bu ağır zəhməti verərək onu belə ağır

mövzular haqqında düşünməyə məcbur edə bilmərəm..bir yandan da insan tərəfim tutaraq məni belə şeyləri düşənməyə vadar edirdi. Birdən ərimin məni səslədiyini və artıq ovçunun getmiş olduğunu dediyini xatırlayıram. Bu yaxşı xəbər olmalı idi. Mən isə düşüncələrimə o qədər aludə olmuşdum ki, artıq heç nə haqqında fikirləşmirdim. ərim mənə yaxınlaşaraq dedi ki, mənim nə düşündüyümü bilir. Yox, bu ola bilməzdi. Yəqin ki, ölümümüzü fikirləşdiyimi düşünmüş olmalı idi..yox, yox, heç də bunu düşünənə oxşamırdı. Mənim kiçik quş gözlərimin içərisinə baxırdı..və dedi: bilirəm, onun niyə bunu etdiyini düşünürsən. Sonra özün-özünün cavabını da vermisən bunu da bilirəm...qəribədir, mən yenə nəysə, nəticədə bir vaxtlar insan olduğumdan bunu düşünməyim elə də qəribə deyildi, lakin həqiqətən bir quş olan o..o bunu necə düşünə bilərdi. Quşların belə şeylər haqqında fikirləşə bildiyini heç bilmirdim...ərimə onun cavabının nə olduğunu soruşdum. Çünki əgər desə idi ki, insanlar bitkilərlə qidalanmalı və heyvan ətini yeməməlidir, mənim digər sualımla üzləşəcəkdi: axı onlar da canlıdır, onları yeməklə də həyatlarına son vermiş olmuruqmu, daha doğrusu

olmurlarmı?...gəl gör ki, ərim mənə bu cavabı vermədi. O dedi ki, bu çox təbiidir, biz quşlar da bizdən kiçik olan qurdları, soxulcanları yeyirik. Və onları yuvamıza balalarımız üçün gətirdiyimiz zamanlar da olur. Bu ovçunun vəziyyəti də bizimki ilə tamam ilə eynidir....ərimin düşüncə səviyyəsi hətta mənimkini, yəni bir vaxtlar insan olmuş mənimkini də üstələmişdi. Onun bu düşüncə tərzini görüb digər bir sual verməkdən özümü saxlaya bilməyərək soruşdum: səni başa düşdüm, amma bunun səncə də heç bir çarəsi yoxdur?..o cavab verdi ki, bunun tək çarəsi bütün canlıların aclıq və susuzluq duyğusunu itirməsi ola bilər. Onun da nə vaxt olacağını bilmir.....açığı mən bu deyilən şeyin bir vaxt, ən azından bu dünya da olacağından əmin deyildimsə də, çıxmadıq candan ümid kəsilməz prinsipini əsas olaraq: bəlkə bir gün...deyə bildim...artıq uça bilərdik. Balalarımız artıq dincəlmiş olduqları üçün həvəslə uçurdular. Qısa bir müddət sonra mənim əvvəldə təsvir etdiyim və armudu qırmış olduğum meşədə idik. Orada həmin armud ağacını tapdıq və üzərinə qonduq. İndi ilk iş özümüzə bir yuva qurmaq idi. Qurduq da..bunun üçün balalarımıza ağacda oturmağı tənbeh etdik.

Həm də ağacdan onlara göz qulaq olmasını xaiş edib yerə endik. Yuvamız üçün yerdən kiçik çubuqlar, otlar axtarırdıq. Birdən ərim böyük bir sevinclə irəliyə doğru uçaraq bir gülün üzərinə atıldı. Və məni də yanına çağırdı. Bu gülün bundan sonra bizim gülümüz olduğunu dedi. Fikirləşdim ki, yəqin onu qırıb mənə verəcək, amma o bunu etmədi. əvvəla gülün yatmış olduğunu, ikinci olaraq da onun həyatına son verməkdənsə, hər gün bura gəlib onu iyləmək, seyr etmək varkən dərməyin mənasız olacağını dedi. Hə, mən bir quşdan insanlıq dərsi alacağımı yatsam, yuxumda da görə bilməzdim..biz gülü oyatmadan işimizə davam etdik.....demək olar ki, gecə olmuşdu...amma yuvamız da hazır idi. Balalarımız da yuvanın içərisində idi....gecə insana xüsusi bir rahatlıq verirdi. İnsan, fərqi yoxdur elə quş olan bir insan da bu səssizlik də itmək istəyirdi..ərim bizim dua vaxtımızın gəldiyini mənə xatırlatdı. Açığı quşların hansı dinə sitayiş etdiyini bilmək mənim özüm üçün də maraqlı idi. ərim başqa bir yerə mən də başqa bir yerə getməli idik. Yəni fərqli ağaclara. Niyə? əgər düzgün başa düşmüşdümsə, əsil ibadət təklikdə mümkün ola biləcəyindən bunu belə

edirdik. Doğrusu, bu sualı ona birbaşa verməmişdim, heç verə də bilməzdim, ona görə onun dimdiyindən sadəcə olaraq söz almışdım...bir az sonra o uçmağa başladı..mən bunun nə cür bir ibadət olduğunu bilmirdim. Ona görə də sadəcə bu gecəyə məxsus bir xəyanət etmək məcburiyyətində idim..ərimi izləyirəm. izlədiyim müddət də isə nə üçün balalarımızın yatmasını gözlədiyimizi, nə üçün onların bu duanı etmədiyini düşünürəm. narahat olmağa ehtiyac yoxdur, çünki cavabları da özüm verirəm. yatmalarını gözlədik çünki beləcə tək qorxmazdılar. Yəni, heyvanlar ağaca çıxa bilməzdi, amma yenə bir ovçu gəlsə idi, onun üçün də eyni şeylər keçərli deyildi. İkinci sualıma gəldikdə isə, yəqin ki, bu onların elə bu gün uçmağı öyrənmələri ilə bağlı olmalı idi..hələ də izləyirəm. görünür ərim tamam bir uzaq yer seçmişdi..nəhayət bir böyürtkən kolunun üzərinə qondu. Oradan ətrafı seyr etməyə başladı. Gecənin qaranlığınımı seyr edirdi. Bir az sonra oxumağa başladı. Bu mahnıda həm kədər, həm də sevinc var idi. İndiyə qədər bunun kimi musiqiyə qulaq asmamışdım...bunda fərqli nəsə var idi. Mən durduğum yerdən onun üzünü görürdüm. Ağlayırdı və gülürdü. Yəni eyni

zamanda həm ağlayır, həm də gülürdü. Ağladığı üçünmü gülürdü, yoxsa güldüyü üçünmü ağlayırdı. Mən insanlar içərisində ibadətin necə edildiyinə çox şahid olmuşam. əvvəla onlar təkdən ziyadə hamısı bir yerdə yığılıb dua edərlər. Sonra daha çox gündüzlər...hə, gündüzlər, hamıyla...birdə bu musiqi, göz yaşları gülüş....bir az sonra gözlərini yumduğunu gördüm....təxminən on beş dəqiqə bu şəkildə qaldı. Tərpənmədən..sadəcə gözlərindən yaşlar axdığını görürdüm....sonra yerə endi...qanadlarını çox geniş açdı...nəsə fikirləşdiyini üzündən qaranlıq olmağına baxmayaraq ay işığının yardımı ilə seçə bilirdim...bir az da gərdi və sonra gülərək qanadları ilə özünü qucaqladı..hə, əminəm, tam olaraq bunu etdi. Amma niyə etdi, bunu bilmirəm. Ona görə yox ki, mənim 11 yaşım var və mən uşağam, bəlkə də ona görə ki, mən insanam. Çünki bu gördüklərimi evdəkilərə və ya elə bütün kənd əhlinə desəm, əvvəlcə mənə gülərlər, sonra da biz nə bilək nə deməkdir, dəlilikdən başqa heç nə deyil deyərlər...iş orasındadır ki, mən bu quşun dəli olmadığını bilirəm. və lap bilməsəm belə, qarşımda durmuş bu quşu niyə bilmirəm, amma nəyin ki, dəli bəlkə də müdrik adlandıraram..səbəb,

izah?...bəzən elə şeylər olur ki, izah etmək olmur, sadəcə hiss etmək olur. Odur ki,  orada mənim yanımda olmayan və bu yazıları oxuyan kimsə bu dediklərimi tam olaraq anlamasa belə bu nə onun, nə də mənim günahımdır....hə, elə burada onu da deyim ki, 11 yaşlı bir uşağın belə bir macərasına inanmaqda çətinlik çəkən oxucu, üstəlik bu uşağın bu şəkildə danışmasını və yaşından daha böyük düşünməsini fikirləşir və təəccüb edirsə, etməsin. çünki, ən çox sual verən, hər şeyi başa düşməyə çalışan, hər şeylə maraqlanan da elə uşaqlardır. Odur ki, mən bu sətirləri yazarkən indiki yaşımın imkan verdiyi səviyyədə yox, o zaman hiss etdiklərimi o zamankı ifadə tərzimlə yazıram....görünür duasını başa çatdırmışdı. Mən onun evə gəlməyə hazırlaşdığını görüb cəld qonmuş olduğum ağacdan qalxaraq geriyə uçmağa başladım. O mənim onu izlədiyimi öyrənməməli idi. Düzdür, bu xəyanət sayılırdı, ancaq mənim başqa çarəm də yox idi. Ona necə bir insan olduğumu deyə bilərdim ki?.....mən yuvamızın yanına çatıb oradan da dayanmadan irəliyə getdim və bir ağacın yarpaqları arasında gizlənərək ərimin qayıtmasını gözlədim....bir az sonra o da çatdı. Yuvamıza daxil

oldu və balalarımızı öpərək ehtimal edirəm ki, məni gözləməyə başladı..beş dəqiqə sonra mən də yuvamıza doğru uçurdum... artıq çatmışdım. Ona baxdım, üzündə sözlərlə ifadə edə bilməyəcəyim nəsə var idi. Nə idi, bilmirəm. çünki heç bir insanın üzündə görmədiym bir şey idi və mən onun nə olduğunu da buna görə dəqiqləşdirə bilmirdim. O məndən duam haqqında soruşacaq deyə əvvəlcə çox qorxdum, ancaq bu məsələyə yaxından və ya uzaqdan heç cür yanaşmadığı üçün bir az rahatlamağa başladım. Həm lap soruşsa nə deyəcəkdim? Yenə yalan? Yox, bu qətiyyən mümkün deyildi. Onsuz da buludlara, balıqlara bu yalanları zarafat adı ilə yetərincə demişdim. İndi isə ərimə deyəcəyim hər hansı bir yalan özümə deyəcəyim yalandan daha betər ola bilərdi. Odur ki, nə o bu məsələyə toxundu, nə də mən. Yəni məndən olsa onun orada nə etdiyini soruşardım, ancaq onda onu izləmiş olduğum, yəni əgər mədəni yox, real desək ona xəyanət etmiş olduğum ortaya çıxacaqdı. Yox, yox, qətiyyən!!!! Beləcə yenə də qanadlarımızı açdıq və balalarımızı qanadlarımız altına alaraq yatdıq.....sabah çox erkən qalxmış və cəh-cəhlərimizlə bütün meşəyə səs salmışdıq.

Təkcə səs salan isə biz deyildik. Bütün meşə əhli özünəməxsus səsi ilə oyandığını bir-birinə xəbər verirdi. Biz cəh-cəh vururduq, ağaclar öz dilləri ilə bizə təşəkkür edir, qaranquş öz dilində sabahınız xeyir olsun deyir, güllər üzərlərindəki şehə üzlərini yuduğu üçün minnətdarlıq edir və bizləri salamlayır, dovşanlar, sincablar, siçanlar, köstəbəklər, qısası bütün təbiət oyanmışam və nə yaxşı ki, oyana, bu gözəl günü görə bilmişəm deyə hayqırırdı. əmin olun bunu görməyə dəyərdi..həm də bir ömür...gözəl təbiət..əziz təbiət, nə yaxşıki burda idi, nə yaxşı ki, onlarla idim. Balalarımız bizi salamlayır yenə dünənki oyunlarını oynamaq üçün bizi səsləyirdilər. Və biz yenə adəta mahnı oxuyuruqmuş kimi səni sevirəm, səni sevirəm deyə cəh-cəh vururduq. Hə, biz həqiqətən xoşbəxt idik. Belə bir sahabda...bilmirəm bəlkə bunu o hissləri təsiri ilə qapıldığım romantika da saya bilərsiniz, amma belə bir gündə, artıq o hissi yaşadıqdan sonra elə oradaca ölə bilərdim..hə, ölə bilərdim. 14 illik həyatım boyunca sanki yaşamış olduğum o hiss görmək üçün yaşamışdım və artıq  bütün qalan həyatım burada sonlansa heç bir təəssüfə yer ola bilməzdi. Çünki mən həyatda olan yaşama

məqsədimə artıq qovuşmuşdum......biz çaya enməmək üçün yarpaqlardakı şehdən içdik. Sonra yenə ağacdan iki armud dərərək səhər yeməyimizi etdik. Bu sırada ağaclar, güllər də şehlə öz səhər yeməklərini yedilər. Hamı xoşbət idi. Mən də, həm də heç olmadığım qədər...yeməkdən sonra təzəcə uçmağı öyrənmiş olan balalarımız bu gün bizimlə birgə uça biləcəklərini və həmçinin bizə yemək tapmaqda, yəqin ki burada söhbət qurq yeməyindən gedirdi, kömək etmək istədiklərini dedilər. Mən əvvəlcə heyrətləndim. Çünki burada bala ana və ataya kömək etməyi böyük bir həvəslə təklif edirdi. Lakin ata və anaları olaraq biz belə qərar verdik ki, onlar bunu ancaq bir həftə sonra, yəni uçmağı və qarşılaşa biləcəyi təhlükələri, xüsusilə də insanları daha dərindən öyrəndikdən sonra edə bilərlər. Bizə sonuna qədər inanan balalarımız bu fikrimizlə razılaşdılar. Elə bu an yanımızdan mavi rəngli bir kəpənək uçaraq bizə salam verdi və biz də onun salamını aldıq. Hə, bu kəpənək salam verməklə kifayətlənməyərək bizə yaxın gəlmiş və balalarımızın dimdiklərindən, alnından da öpmüşdü...tam səmimiyyəti və sevgisi ilə..o bunu edərkən mən onun qanadlarını daha

yaxından görə bilmişdim. Bu rəng..çox, amma çox gözəl idi. Və bir vaxtlat eyni ilə belə bir kəpənəyi mən, yəni insan olan mən bir bankanın içərisinə salaraq orada sazlamağa çalışmışdım. Üstəlik bu tək bir kəpənək də deyildi. Təxminən müxtəlif rəngli, bəzəkli, hətta bəlkə də ətirli on kəpənək idi. Guya mən onlara ev düzəltmişdim. Amma indi başa düşürdüm ki, mən onlara ev yox, zindan hazırlamış və onları da orada dustaq etmişəm. kəpənəyin üzünə baxa bilmirdim. Axı necə baxa bilərdim? Utanırdım, yox təkcə utanmırdım, xəcalət çəkirdim, yerin altına girmək, yox olmaq, məhv olmaq, ölmək, ən ağır cəzalara layiq görülmək istəyirdim. Çünki mən bu dediklərimin hamısına laiq idi. Çünki mən qatil idim, qatil!!....məni sakit görən kəpənək yaxınlaşdı və bunun səbəbini soruşdu. Məndən bir müddət cavab ala bilməyən kəpənək dedi ki, məni çox sevir. Mənim gözlərimdən bir damla yaş dimdiyimə doğru axraq dimdiyimdən ağzıma daxil oldu. O an fikirləşdim ki, görəsən bu kəpənək mənim insan olduğumu bilsə idi, yenə də məni sevdiyini deyərdimi...bunları düşünərkən dimdiyimdən birdən..insan..kimi sözlər qeyri-ixtiyari olaraq çıxdı. Kəpənək ardını

deməyimə icazə vermədən dedi ki: “yenə insanlarla bağlı nəsə olubsa, bunun üçün kədərlənmə, həm onlar bizi tanısalar, başa düşsələr bizə heç bir pislik etməzlər. İndi bizi tanımırlar deyə belə edirlər. Ona görə də onların da heç bir günahı yoxdur.” Eşitdiyim bu şeylərin üzərinə mənim deyiləcək bir sözüm qalmamışdı. əgər təsadüfən var idisə də, onu xatırlayacaq bir beynim qalmamışdı. Kəpənək daha heç bir söz deməyərək dimdiyimin kənarından öpdü və bizə xoş gün arzu edərək uçub getdi...ərim də onun etdiyini etdi. Yəni məni sevdiyini dedi, dimdiyimin kənarından öpdü..o anda mənim də dimdiyim azcıq açıldı və ona onu sevdiyimi dedim.....bir az sonra vəziyyətim düzəlmiş olduğundan bu gün ilk olaraq kimin yemək üçün getməli olduğunu aydınlaşdırmalı idik. Söhbətimizdən belə başa düşdüm ki, dünən  və və bu gün mənim növbəm idi. Bir anlıq özlüyümdə fikirləşdim ki, əgər dünən onun növbəsi deyildisə, nə üçün balalarımızı yuvada tək qoymuşdu? Bunu bir başa soruşa bilmədiyim üçün ona bəs sən nə edəcəksən deyə sual vermək cəsarətini göstərdim. Cəsarət deyirəm çünki növbəti gülüşlə qarşılaşmaqdan qorxurdum. Amma ərim gülmədən

bu gün də balalarımızla oynayacağını, artıq uçmağı öyrəndikləri üçün onlarla uçuş məşqləri edəcəyini və nəhayət yenə dünənki kimi mənim gəlməyimə az qamış ətrafda təhlükə olub-olmadığından əmin olmaq üçün bir müddətliyinə balalarımızı ağaca tapşıraraq yoxlama uçuşuna çıxacağını və qayıdanda onlar üçün su gətirəcəyini dedi...düzü, bu gün mənim sıramın olması tam yerinə düşmüşdü. Çünki mən evimə, yəni insan olan vaxtkı evimə getmək və əsil Sarıköynəyin vəziyyətini öyrənmək istəyirdim. Odur ki, vaxt itirmədən sağ ollaşıb, yəni hər birini öpüb, onları çox sevdiyimi deyərək, oradan ayrıldım...oradan ayrılan kimi ağlıma gələn bir şey məni düşünməyə vadar etdi. Axı dünən suyu niyə çaydan gətirmiş oradakı insanların suyuna toxunmamışdı? Bunu mənim quş olsa da, insan kimi fikirləşməkdən əl çəkməyən ağlım cavablandıra biməzdi......səmadayam, yenə də uçuram və yenə də bundan zövq alıram. Bəlkə hələ quş olaraq ikinci günüm olduğu üçün, bəlkə də uçmağın heç vaxt doymayacağım gözəl bir şey olduğu üçün...uçmaq? fərqli hiss idi, bu müddətdə insanlardan yuxarıda olmağıma rəğmən, hamının bərabər olduğunu bilmək, bu tamam fərqli bir hiss

idi...evimiz olan səmtə az qalırdım..qonşumuzun həyətinin tam üzərindəyəm. Uşağı boşqabı sındırıb. Anası bunun üçün həyətdə onu danlayır və ona çox böyük bir cəza verəcəyini deyərək hədə qorxu gəlir. Təbii ki, bundan sonra uşaq daha da bərk ağlayır. Tam mənası ilə onların üzərindən keçirəm. və, aha, bu nədir? Qeyri-iradi olaraq bədənimin məlum yerindən mayeyə bənzər, amma həm də bir az qatı olan nəsə məndən aşağıya doğru axmağa başlayır. Onların üstündən uçub geçirəm. arxamdan uşağın anasının dediyi, səni görüm.....bundan sonra bəzi qarğış və təhqirlər gəlir..hə, deyəsən mən....nə edə bilərəm, axı qeyri-iradi olmuşdu. Həm mən bir quşam....öz evimizin yanına çatmışam. Dünən Sarı köynəyin oturmuş olduğu söyüd ağacının üzərində oturmuşam. Cəh-cəh vururam...evimizdə tam sakitlik hökm sürür.bəlkə də hələ günorta olmadığı üçün. Çünki bu vaxta qədər baba və nənəm oyansalar da, aşağı düşməzlərdi. Atam artıq heyvanlarımızı kəndin bəzi başqa heyvanları ilə birlikdə otlamağa aparmış olmalı idi. Bəs anam? Anam! Çox qəribə səslənir. Mən ki indi özüm də ana idim. Bunları düşünərkən bir yandan da cəh-cəh vurmağa davam edirdim. Odur ki, mən, yəni

əsil Sarıköynək səsimi eşidib çölə atıldı. Darvazanın qapısını açıb mənə doğru gəlməyə başladı..mən onun üzünə baxırdım. Onun nə hiss etdiyini bilmək istəyirdim. Çünki əgər mümkün olsa idi, mən həmişəlik onunla yerimi dəyişmək istədiyimi ona deyəcək və onu razı salmaq üçün əlimdən gələni edəcəkdim. Ona görə də baxırdım. Amma onun üzündə nə xoşbəxtlik, nə də bədbəxtlik duyğusunu görə bilirdim. Bu duyğuların yerinə daha fərqli, daha güclü bir duyğu var idi. Mən bu duyğunun nə olduğunu tam olaraq başa düşə bilmirdim..qorxaraq da olsa dimdiyimi açmağa cəsarət edərək ona salam verdim və cavabını gözləməyə başladım...hələ də gözləyirdim....amma cavab yox idi. Təxminən 5 dəqiqə səssizlikdən sonra insan cildindəki əsil Sarıköynəyin gözlərindən bir damla yaş yerə düşdü. Yox, bu yaş yerə düşməmişdi, onun gözlərindən birbaşa mənim ürəyimə düşmüşdü. Mənim balaca Sarıköynək ürəyimə. Sonra da həmin göz yaşı damlası mənim sağ gözümdən yerə düşdü. Sarıköynək heç nə demirdi, heç nə, amma həm də çox şey deyirdi...uzun sükutdan sonra axır dayana bilməyib ondan vəziyyətin bu qədərmi çox pis olduğunu

soruşmağa özümdə güc tapdım. O hələ də susurdu. Görünən o idi ki, təkcə mənim gördüklərim deyil, onun gördükləri də onu yetərincə heyrətləndirmişdi. Hətta sözün bittiyi yerə gətirmişdi desəm daha dəqiq olar...amma yox, ən nahayətində yenə də bu sözləri deyə bilmişdi: təkcə ananı yox, digərlərini də başa düş və sev!.....hə, başa düş və sev...mən məsələnin nə yerdə olduğunu başa düşmüşdüm. əlavə sözə ehtiyac yox idi. Səssizcə ağacdan uçaraq tam onun ürəyinin üzəri səmtdə dayandım. Sarıköynək gözlərində yaşlarla məni qucaqlayaraq ürəyinə sıxdı....bir az sonra hər şey əvvəlki kimi idi. Yəni artıq mən mən idim. Bəlkə də deyildim. Axır ki, insan kimi görünürdüm. Birdən içəridən anamın qışqıraraq məni çağırdığını eşitdim. Səsindən çox əsəbi olduğu və əgər o dəqiqə getməsəm vəziyyətin mənim üçün heç də yaxşı olmayacağını başa düşdüyümdən qarşımda duran Sarıköynəyə məni burada gözləməsini və tez qayıdacağımı deyərək evə doğru qaçmağa başladım. Evə girmək üzərəykən arxama baxdım Sarıköynək orada yox idi. Hə, yox idi...evdə anam çörəyi alıb gətirməklə canımı qurtara bilməyəcəyimi deyirdi. Nə çörəyi?

Nə badə bu dünənki çörək olmaya idi..yox, deyildi! Çünki anam sözünü davam etdirərək dedi ki, dünən çörəyi aldıqdan sonra mənə icazə vermiş olması bunun bu gün də belə olacağı mənasına gəlmir. Amma iş bununla da bitmirdi. Həmçinin, anam, hər nə qədər dünən ona çox kömək etmiş olsam da, ona xoş sözlər demiş olsam da, bunun mənə istədiyim kuklanın alınması üçün ona heç bir əsas vermədiyini və bu şirinliklərin ona keçmədiyini deyib məni tam olaraq nə olduğunu xatırlamadığım bir şeyi qonşumuza vermək üçün göndərdi....çölə çıxdım..söyüd ağacının yanına çatdım. Baxdım...baxdım..baxdım....sonra göyə də baxdım....buludlar da baxdım...buludların arasında uçun quşlara da.....amma yalnızca baxmaqla qalmadım, hamısını gördüm. Onların da məni gördüyünü bilərək gördüm.....